Jurnal 04.07.2019-cu ildə
Azərbaycan Respublikası
Ədliyyə Nazirliyi
Mətbu nəşrlərin
reyestrinə daxil edilmişdir.
Reyestr № 4243

The journal is included in the
register of Press editions of the
Ministry of Justice
of the Republic of Azerbaijan
on 04.07.2019.
Registration No. 4243



**Redaksiyanın ünvanı**
AZ1073, Bakı şəh.,
Mətbuat prospekti, 529,
“Azərbaycan” nəşriyyatı,
6-cı mərtəbə

**Editorial address**
AZ1073, Baku,
Matbuat avenue, 529,
“Azerbaijan” Publishing House,
6-th floor

**Tel.:** +994 50 209 59 68
+994 55 209 59 68
+994 99 805 67 68
+994 12 510 63 99

**e-mail:**
tebiet.elm2000@aem.az

## Beynəlxalq indekslər / International indeces

ISSN: 2707-1146
e-ISSN: 2709-4189
DOI: 10.36719

























































## Chemistry

**Prof. Dr. Vagif ABBASOV**, Institute of Petrochemical Processes of ANAS / Azerbaijan
**Prof. Dr. Nazim MURADOV,** University of Central Florida / USA
**Prof. Dr. Georgi DUKA**, Moldovan Academy of Sciences / Moldova
**Prof. Dr. Vagif FARZALIYEV**, ANAS Institute of Chemistry of Additives / Azerbaijan
**Prof. Dr. Shahana HUSEYNOVA**, Technical University of Berlin / Germany
**Prof. Dr. Ali ZALOV**, Azerbaijan State Pedagogical University / Azerbaijan
**Assoc. Prof. Dr. Fizza MAMMADOVA**, ANAS Nakhchivan Institute of Natural Resources / Azerbaijan
**Assoc. Dr. Bilal BUSHRA**, Muhammad Ali Jinnah University / Pakistan

## Earth sciences and geography

**Prof. Dr. Elkhan NURIYEV**, Baku State University / Azerbaijan
**Prof. Dr. Salih SHAHIN**, Gazi University / Turkey
**Prof. Dr. Mehmet UNLU**, Marmara University / Turkey
**Prof. Dr. Shakar MAMMADOVA**, Baku State University / Azerbaijan
**Assoc. Prof. Dr. Anvar ALIYEV**, ANAS Institute of Geography / Azerbaijan

## BİOLOGİYA ELMLƏRİ VƏ AQRAR ELMLƏR

## BIOLOGICAL SCIENCES AND AGRARIAN SCIENCES

DOI: https://doi.org/10.36719/2707-1146/29/7-13

**Elfira Zaur qızı Ağayeva**
Gəncə Dövlət Universiteti
biologiya üzrə fəlsəfə doktoru
shanur@rambler.ru
**Güləbatın Vaqif qızı Hümbətova**
Gəncə Dövlət Universiteti
aqrar elmləri üzrə fəlsəfə doktoru
humbatovagulebatin@gmail.com
UOT: 575.17:582.736+577.21

# NADİR NÖV OLAN *ASTRAGALUS GJUNAICUS A.GROSSH. (FABACEAE)* NÖVDAXİLİ POLİMORFİZMİNİN ÖYRƏNİLMƏSİ

**Xülasə**

Azərbaycanda nadir endemik növ olan Astragalus gjunaicusun altı populyasiyasının genetik müxtəlifliyini qiymətləndirmək üçün genom DNT-nin (ISSR) növlərarası analiz metodundan istifadə edilib. Beş primerlə DNT amplifikasiyası nəticəsində 89 DNT fraqmenti əldə edilmişdir ki, onlardan 81-i (94,1%) polimorf olmuşdur. Zivlan populyasiyasının digər populyasiyalarla müqayisədə oxşarlıq səviyyəsi aşağı, Nei oxşarlıq əmsalı isə 0,139 idi. Zivlan populyasiyasının digər populyasiyalarla aşağı oxşarlığı onun uzunmüddətli təcrid olunmasını sübut edir. Əldə edilmiş nəticələr əsasında Astragalus gjunaicusun mühafizəsi strategiyası təklif edilmişdir.

***Açar sözlər:*** *Fabaceae, Astragalus gjunaicus, genetik dəyişkənlik, ISSR, nadir növ, bitkilərin mühafizəsi*

**Elfira Zaur Aghayeva**
Gandja State University
Ph.D in Biology
shanur@rambler.ru
**Gulabatin Vagif Humbatova**
Gandja State University
Ph.D in Agricultural Sciences
humbatovagulebatin@gmail.com

# Study of intraspecific polymorphism of rare species *Astragalus gjunaicus A.Grossh. (FABACEAE)*

**Abstract**

The method of interspecific analysis of genome DNA (ISSR) was used to assess the genetic diversity of six populations of *Astragalus gjunaicus*, a rare endemic species in Azerbaijan. As a result of DNA amplification with five primers, 89 DNA fragments were obtained, of which 81 (94.1%) were polymorphic. The Zivlan population had a low level of similarity compared to other populations, with a Nei similarity coefficient of 0.139. The low similarity of the Zivlan population to other populations proves its long-term isolation. Based on the results obtained, a strategy for the protection of Astragalus gjunaicus has been proposed.

***Keywords:*** *Fabaceae, Astragalus gjunaicus, genetic variability, ISSR, rare species, plant protection*

## Giriş

Genom DNT-nin mikrosatellit sahələrinin arası analizinin üsulu (ISSR) Azərbaycanın nadir endemik növü olan *Astragalus gjunaicus* altı populyasiyasının genetik müxtəlifliyinin qiymətləndirilməsi üçün istifadə olunmuşdur. DNT-nin beş praymerlə amplifikasiyası nəticəsində 89 DNT fraqmenti əldə olunmuşdur ki, onlardan 81-i (94.1%) polimorfdur. Zivlən populyasiyasının digər populyasiyalara nisbətən aşağı oxşarlıq səviyyəsi müəyyən olunmuşdur, Nei oxşarlıq əmsalı 0.139 təşkil edirdi. Zivlən populyasiyasının digər populyasiyalara oxşarlıq göstəricisinin azlığı, onun kifayət qədər uzun müddətli təcrid olunmasını sübut edir. Əldə olunmuş nəticələrin əsasında *Astragalus gjunaicus* qorunması strategiyası təklif olunub.

Müasir dövrdə bioloji müxtəlifliyin qorunması problemi aktuallığını dahada artırır. İnsanın təbiətə təsirinin intensivliyi ümumbəşər xüsusiyyət daşıyır və çoxsaylı növlərin itirilməsinə gətirib çıxarır.

Nadir, mühafizəyə ehtiyacı olan növlər sırasına güney gəvəni (pasxladəni) *Astragalus gjunaicus* Grossh. (şək. 1) aid edilir.



**Şək. 1. Astragalus gjunaicus – güney gəvəni (paxladən)**

Göygöl sahillərinin şimal və şərqində darlokal yayılması olan endemik növ *A. gjunaicus* pleystosen bozqır reliktlərinə aiddir (Malyshev, Peshkova, 1984: 265; Redkiye i ischezayushchiye rasteniya Sibiri, 1980: 223).

Növ Qırmızı kitaba daxil edilib (Alekseyeva, Boykov, 2002: 39). Göy-gölün sahillərində, eləcə də sahil torpaqlarının açıq ərazilərində çuxurlarda təsadüf edilir. Təcrid olunmuş sahələrdə məhdud ərazidə yaşayır. Məlum olan populyasiyaların əksəriyyəti Göygöl gölünün şimal sahilində, Zivlən populyasiyası şərq sahildə arealın əsas hissəsindən 3 km uzaqlıqda yaşayır (şək.2).

*A. gjunaicus* populyasiyası Zivlən kəndi yaxınlığında Göygöl Milli Parkında mühafizə altındadır. Ancaq son illərdə bu ərazidə turist sahəsinin fəal inkişafı getdiyi üçün *A. gjunaicus* yaşadığı ərazilərə antropogen yüklənmə ildən ilə artır.




**Şək. 2. Şəkil-xəritə. Gəncə-Qazax bölgəsi üzrə Astragalus gjunaicus A.Grossh. arealı**

Gəvənin bu növü yaşayışın ekstremal sahələrində təsadüf etdiyi üçün, istənilən antropogen təsir populyasiyanın sayının kəskin azalmasına gətirib çıxarır ki, onun sonrakı mövcudluğunu təhlükə altına alır. A. *gjunaicus* növünə çarpaz to zlanma xasdır və o müstəsna olaraq toxumla çoxalır. Toxumların mayalanması hava şəraitindən asılı olaraq müxtəlif illərdə güclü dərəcədə dəyişir (Tulokhonov, 2009: 17-22). Belə ki, Zivlən populyasiyasında 2018-ci ildə hər fərdə görə 898 toxum, 2019-cu ildə -500, 2020-ci ildə isə fərdə görə - 2347 toxum əmələ gətiridilər. Çox zaman toxumlar tam mayalanmır və yaxud həşaratlar tərəfindən güclü dərəcədə zədələnirlər (təcrübə illərində Zivlən populyasiyasında tamqiymətli toxumların payı 10-23% arasında olurdu).

Beynəlxalq Təbii sərvətlər və Təbiəti Mühafizə İttifaqı (IUCN) təbiəti mühafizə tədbirlərinin aparılması və planlaşdırılması zamanı, növ müxtəlifliyinin və ekoloji sistemlərin müxtəlifliyinin öyrənilməsində genetik tərkibinin də tədqiqinin vacibliyini qəbul etdi (Sandanov, Selyutina, Dulepova, 2014: 295-305).

Nadir növlərin mühafizəsi strategiyasının işlənməsi zamanı növlərin populyasiyalarının genetik differensasiyası və genetik dəyişkənliyinin səviyyəsi haqda mümkün qədər çox məlumatın olması vacibdir. Bu ilk növbədə öyrənilən növlərin maksimum çox saylı genetik müxtəlifliyə malik mərkəzlərin aşkarlanması üçün çox vacibdir.

Nadir növlərin genetik müxtəlifliyini öyrənmək məqsədilə onların mühafizəsi üçün son zamanlar molekulyar üsullardan geniş istifadə olunur.

ISSR- nişanlama üsulu populyasiya və taksonomik tədqiqatlarda geniş istifadə olunur, çünki İSSR markerlər yüksək dərəcə variabelliyə malikdirlər (Gupta, Chyi, Romero-Severson, Owen, 1994: 998-1006; Nybom, 2004: 1143-1155).

DNT polimorfizminin öyrənilməsi metodlarına nisbətən bu üsul yaxşı həyata keçirilir, az əmək tələb edir və daha sadədir (Harris, 1999: 221-228). Mikrosatellitarası markerlərin tədqiqi metodu (İSSR- metod) digər üsullarda mümkün olandan daha çox polimorf lokuslar aşkarlamağa imkan verir (Esselman, Jianqiang, Crawford, 1999: 443-451). ISSR-markerlər dominant tip irsiyyətinə aiddirlər, onlar istifadə üçün çox sərfəlidirlər, DNT ardıcıllığı haqda ilkin məlumat tələb etmirlər, bununla yanaşı RAPD- markerlərə nisbətən daha çox təkrarlana bilən nəticələr verirlər (Wolfe, Xiang, Kephart, 1998: 1107-1125).

Bununla əlaqəli olaraq *A. gjunaicus* populyasiyalarının genetik dəyişkənliyi və genetik differensasiyasının tədqiqi aktualdır.

Təqdim olunan tədqiqatın məqsədi - nadir endemik növ olan *A. gjunaicus* genom DNT-nin mikrosatellitarası sahələrinin analizi üsulu vasitəsilə (ISSR) genetik differensasiyasının öyrənilməsidir.

**Material və metodlar**. Bizim tərəfimizdən təbii yeddi məlum olan *A. gjunaicus* populyasiyalarının altısının nümunələri tədqiq olunublar: bir populyasiya şərqi sahildən, digərləri şimal.

***Göygöl gölünün şərq sahili***

**Göygöl populyasiyası.** Külək yelləyən çuxurun xarici divarı, müxtəlifotlu-sivriyarpaq assosiasiya.

***Göygöl gölünün şimal sahili***

Zivlən 1. populyasiyası 1. Müxtəlifotlu-qatırquyruğu assosiasiyası.

Zivlən 2 populyasiyası 2. Çovdarsünbüllü assosiasiya.

Goranboy populyasiyası. Çovdarsünbüllü assosiasiya.

Faxralı populyasiyası 1. Müxtəlifotlu-gəvən assosiasiyası.

Naftalan populyasiyası 2. Müxtəlifotlu-gəvən assosiasiyası.

Hər populyasiyadan 7-dən 8-ə qədər nümunə tədqiq olunub. DNT-ni cücərmiş toxumlarının qurudulmuş 7-9 mq bitki toxumasından CTAB üsulunun bir qədər modifikasiyalarıyla ayırmışıq (Doyle, 1987: 11-15). İş prosesində aşkarlandı ki, güney gəvənin DNT-nin ayrılması üçün istifadə olunan material kimi bitkinin inkişafının istənilən fazasında olan yaşıl yarpaqlarından yararlanmaq olar. Ancaq daha uyğun material kimi 5-7 günlük cücərtiləri münasibdilər, çünki onları laboratoriya şəraitində ilin bütün fəsillərində əldə etmək olar. Həmçinin cücərtilərdən əldə olunan DNT daha az miqdarda qarışıqlara malik olur.

Polimeraz zəncirvari reaksiyanı (PZR) C1000 Thermal Cycler (BioRad Laboratories, USA) amplifikatorunda aşağıdakı protokola uyğun həyata keçirmişik: DNT-nin ilkin denaturasiyası 1.30 dəq.

94°C dərəcədə; 35 amplifikasiya dövrü, buraya 0,40 dəqiqə ərzində 94 °C temperaturda DNT-nin denaturasiyasıda daxildir, 41–54 °C – 0.45 dəq praymerin yandırılması və 72 °C – 1.30 dəq. zəncirin elonqasiyası; yekun mərhələdə 72 °C dərəcədə – 5 dəq. Amplifikasiya üçün 50 nq matriks və 1,5 vahid Taq-polimerazadan (Rusiya, Medi-gen) ibarət PZR reaktivlərinin qarışığını hazırlamışıq (Frankel, 1974: 53-65).

Amplifikasiya üçün 19 praymer istifadə etmişik. Amplifikasiya qarışığının təmizliyini qiymətləndirilməsi üçün mənfi nəzarətdən istifadə etmişik, nəzarət nümunəsi DNT əlavə olunmadan amplifikasiya qarışığını tamlıqla saxlayırdı. Xarici qrup kimi *Gueldenstaedtia monophylla* istifadə etmişik.

Amplifikasiya məhsullarını elektroforez vasitəsilə 1%-li aqaroz geldə 1×TBE buferdə parçalayırdıq. Boyaq qismində CYBR-Green istifadə etmişik, onu gelə köçürmədən əvvəl bilavasitə hər nümunəyə əlavə edirdik. Gellərin U-B şüaları altında fotoşəkillərini alırdıq (Bio-Rad GelDoc XR+).

Elektroforeqramlar əsasında binar matrikslər qurulub, burada hər amplikon marker kimi nəzərdən keçirilirdi və onun mövcudluğu (1) və yaxud olmaması (2) qeydə alınırdı. Geldə oxşar hərəkətliliyi nümayiş edən amplikonları RAPD və İSSR metodlardan istifadə olunan tədiqatlarda adətən qəbul edilən homoloji hesab edirdik (O'Hanlon, Peakall, 2000: 15-16; Rossello, CebriAn, Mayol, 2002: 321-327) tövsiyələrinə uyğun olaraq amplikonların boyanma intensivliyinin nəzərə almırdıq. DNT fraqmentlər şüalanmanın müxtəlif gücünü nümayiş edirdilər, ancaq bizim işimizdə yalnız aydın, yaxşı seçilən amplikonları qeydə alırdıq. Nümunələr arası oxşarlıq meyarı kimi məsafənin ölçüsü seçilmişdir (Nei, Li, 1979: 5269-5273):

$$D = 2N_{ab}/N_a + N_b$$

Burada $N_a$ və $N_b$ – a və b nümunələrinin amplifikasiya olunmuş fraqmentlərinin sayı; $N_{ab}$ - a və b nümunələrinin uyğun elektroforeqrafik hərəkətli fraqmentlərin sayı. Məlumatların klaster analizi UPGMA metodu ilə TreeCon 3.1. proqramı vasitəsilə həyata keçirilib. Butstrep qiymətləri 1000 təkrar üçün hesablanıb.

*A. gjunaicus* genom DNT-si ilə aparılan PZR reaksiya zamanı tərəfimizdən nukleotid ardıcıllıqlarına görə fərqlənən 19 praymer təcrübədən keçirilmişdir. Tədqiq olunan praymerlərin 14-dən amplifikasiya əldə olunmuşdur, və yalnız 11 praymer *A. gjunaicus* genotipik müxtəlifliyinin öyrənilməsi üçün daha effektiv olmuşdur. Bu praymerlər çoxsaylı dəqiq yaxşı təkrarlana bilən amplikonlar yaradırdılar ki, sonradan genetik analiz üçün seçilmişdirlər. Populyasiyaarası fərqlər ən gözəl şəkildə beş markerlə aşkarlanmışlar (cəd.1). Beş praymerin istifadəsi ilə DNT amplifikasiyası zamanı DNT-nin 89 fraqmenti əldə olunmuşdur (amplikon), onlar dan 81 polimorfdu. Praymerlərin hamısı üçün polimorf lokuslarının payı hər növ üçün 94.1 % təşkil etmişdir. Öyrənilən altı populyasiyadan olan bitkilərin DNT-nin amplifikasiyası zamanı əldə olunan fraqmentlərin sayı 14-dən (814, 99A) 25 (M10) qədər tərəddüd edirdi. Hər praymerə görə amplikonların orta sayı 18,2, polimorf amplikonların orta sayı – 17,2.

**Cədvəl 1.**
**Populyasiyaarası differensasiyanın tədqiqində İSSR PZR -də istifadə olunan praymerlərin xüsusiyyətləri**

| Marker | Ardıcıllıq (5->3) | t, ist $^0$C | | Polimorf fraqmentlərin sayı | P,% |
|---|---|---|---|---|---|
| 814 | $(CT)_7$CTT,-<G> | 51 | 14 | 13 | 92,9 |
| 99A | $(CA)_6$A-<G> | 47 | 14 | 13 | 92,9 |
| HB11 | $(GT)_6$C-<G> | 50 | 16 | 15 | 93,7 |
| M1 | $(AC)_8$-<G> | 56 | 22 | 21 | 95,5 |
| M10 | $(CA)_6$R-<G> | 42 | 25 | 24 | 96,0 |

Populyasiyalar arası oxşarlıq meyarı kimi Nei (D) məsafə dəyəri seçildi. Tədqiq olunan bütün populyasiyalar arası oxşarlıq əmsalının qiymətləri 0-dan 0,909 qədər dəyişirdilər. (Cəd.2). Genetik oxşarlığın ən aşağı qiymətləri Zivlən populyasiyalarına xasdılar. Bu populyasiya ilə digər populyasiyalar arası oxşarlıq əmsalı müxtəlif praymerlərə görə 0-dan 0,333 qədər tərəddüd edirdi. Bu zaman ən çox fərqləri 99A praymeri nümayiş etdirdi – oxşarlıq əmsalı D 0,166-dan (Zivlən – Million) 0,333 qədər (Zivlən - Zivlən) təşkil etdi, və ümumilikdə bütün praymerlər üçün 0,129-dan 0,178 qədər (orta hesabla 0,145) olmuşdur.

Ən çox genetik oxşarlıq Zivlən1 və Zivlən2 populyasiyaları arasında aşkarlanmışdır, Oxşarlıq əmsalının qiyməti 0,750-dən (M1) 1,00 (M10) qədər, və orta hesabla D = 0,851 təşkil edirdi. Goranboy populyasiya Zivlən 2 populyasiya ilə əhəmiyyətli dərəcədə oxşarlığa malikdir – D = 0,666-dan (M1, HB11) 0.909 (99A, M10) qədər, beş praymerə görə orta hesabla D = 0,790 və, bir qədər az oxşarlıq Zivlən 1 populyasiyası ilə D = 0,500-dən (M1).

D = 0.909 (99A, M10) qədər, orta hesabla beş praymerə görə D = 0.747.

**Cədvəl 2**

***A. gjunaicus* beş praymer əsasında maksimum populyasiyaarası differensasiyanı nümayiş edən Nei genetik məsafə**

| Populyasiya | Göygöl | Zivlən1 | Zivlən2 | Faxralı1 | Naftalan2 | Goranboy |
|---|---|---|---|---|---|---|
| Göygöl | | 0,137 | 0,178 | 0,153 | 0,129 | 0,130 |
| Zivlən1 | | | 0,777 | 0,558 | 0,550 | 0,465 |
| Zivlən2 | | | | 0,503 | 0,423 | 0,493 |
| Faxralı1 | | | | | 0,851 | 0,747 |
| Naftalan2 | | | | | | 0,790 |




**Şək. 3. *A. gjunaicus* altı populyasiyası arasında (Nei, Li, 1972) genetik qiymətlər matriksinin əmsalının əsasında qurulmuşUPGMA-dendroqram Rəqəmlərlə butstren-dayağın ölçüsü göstərilib (%).**

Faxralı1 və Naftalan2 populyasiyaları arasında oxşarlıq əmsalı 0,545-dən (M1)1,00 (99A) qədər təşkil edirdi, beş praymerə əsasən bu əmsalın qiymətinin orta göstəricisi D = 0, 777. D-nin yüksək göstəriciləri bu populyasiyaların yaxın qohumluğuna işarə edirlər. Zivlən1, Zivlən2 və Goranboy qrupu Faxralı1 və Naftalan2 populyasiya qrupları ilə coğrafi cəhətdən məsafədədilər, onlar arasında oxşarlıq əmsalı bütün praymerlər üzrə D = 0.423–0.558. təşkil edir.

UPGMA-dendroqramın məlumatları Göygöl populyasiyasının arealın əsas hissəsinin populyasiyaları ilə müqayisədə əhəmiyyətli dərəcədə genetik differensasiyasını nümayiş edir (butstrep-dayaqla 100%) (şək.3). Həmçinin Zivlən1 və Zivlən2 populyasiyaları yüksək dərəcədə oxşarlıq səviyyəsini, Goranboy, Faxralı1 və Naftalan2 onlara yaxınlıq nümayiş edirlər.

Bitki populyasiyalarının genetik differensasiyası növün uzunmüddətli təkamül tarixinin qarşılıqlı təsirini, onun daxilində mutasiya, genetik dreyf, genlər axını və seçmə kimi baş verən genetik proseslərləri əks etdirir (yəni, arealın dəyişməsi, yaşayış yerlərinin fraqmentləşməsi və populyasiyaların təcridi) (Schaal, Haywotth, Olsen, 1998: 465-474).

Bitkilərin müxtəlif növləri populyasiyalar arasında genetik müxtəlifliyin paylanması strukturuna görə fərqlənirlər. Coğrafi yerləşmə, ətraf mühit şəraiti, yaşayış yerlərinin azalması və parçalanma məhdud yayılma ilə növlərdə populyasiyanın fərqliliyini artıra bilən amillərdir (Travis, Maschinski, Keim, 1996: 735-745).

*A. gjunaicus* arealının şərq hissəsində yerləşən Göygöl populyasiyası arealın əsas (mərkəzi) hissəsindən ən uzaq məsafədədir. Arealın əsas hissəsinin populyasiyaları arasındakı güclü genetik differensasiya, bir tərəfdən, Zivlən populyasiyası ilə digər tərəfdən bizim fikrimizcə bu populyasiyanın fərqli ekoloji şəraitdə uzunmüddətli Göygöl gölünün şərq sahilində coğrafi təcridinin nəticəsidir

Goranboy rayonundakı azsaylı populyasiya son 50-60 il ərzində təcrid olunubdur. O, Zivlən populyasiyasından təcrid olunubdur. Baxmayaraq ki, keçmişdə Zivlən1 və Zivlən2 ilə tək populyasiya təşkil edən Göygöl populyasiyası 50 il müddətində təcriddə olmuşdur, onlar arasında genetik differensasiya aşkarlanmamışdır. Cüt populyasiyaların oxşarlığı (Faxralı1, Naftalan2 və Zivlən1 Zivlən2) onların bir-birinə yaxın yerləşməsi ilə əlaqəlidrir ki, çox guman varki onlar ümumi genofonda malikdirlər.

Bəzi çoxillik çarpaztozlanan taksonlar arasında əhəmiyyətli dərəcədə genetik differensasiyanı yalnız 600 il təcriddən sonra aşkarlamışlar (Su, Qu, He, 2003: 212-219). Bu məlumatlar bizim əldə etdiyimiz nəticələrlə uyğundurlar. Populyasiyaların əsas qruplarıyla digərlərindən uzun müddət ərzində təcrid olan Göygöl populyasiyalarının arasında maksimal genetik fərqlər müəyyən olunur.

## Nəticə

Əldə olunan nəticələr təcrid olunmuş və coğrafi cəhətdən uzaqda yerləşən populyasiyalar arasında əhəmiyyətli dərəcədə differensasiyanın mövcudluğunu subut edirlər. Populyasiya cütləri arasında orta səviyyədə oxşarlıq 0,459 təşkil edir. *A. gjunaicus* üçün bizim tərəfimizdən əldə olunan populyasiya-genetik fərqlərinin xüsusiyyətləri, bu növün qorunması strategiyasının işlənilməsində böyük əhəmiyyət kəsb edir. *A. gjunaicus* populyasiyalarının yüksək səviyyədə genetik differen-sasiyasını nəzərə alaraq, mövcud populyasiyaların hamısının *in situ* qorunması bu sahədə üstünlük təşkil edən məsələ (prioritet) olmalıdır.

*A. gjunaicus* populyasiyaları üçün aşkar edilmiş yüksək dərəcədə fərqlilik genetik bankın yaradılması zamanı və bu növün introduksiyası və reintroduksiyası üzrə işlər aparılarkən nəzərə alınmalıdır.

## Ədəbiyyat

1. Malyshev, L., Peshkova, G. (1984). Osobennosti i genezis flory Sibiri (Predbaykal'ye i Zabaykal'ye). Novosibirsk, 265 s.
2. Redkiye i ischezayushchiye rasteniya Sibiri. (1980). Novosibirsk, 223 s.
3. Alekseyeva, Ye., Boykov, T. (2002). Astragal shelkovisto-sedoy – Astragalus serioceocanus Gontsch. Krasnaya kniga Respubliki Buryatiya: Redkiye i ischezayushchiye vidy rasteniy i gribov. Novosibirsk, 39 s.
4. Tulokhonov, A. (2009). Sistemnyy podkhod k prirodopol'zovaniyu v Baykal'skom regione. Geografiya i prirod. Resursy. № 3, s.17-22.
5. Sandanov, D., Selyutina, I., Dulepova, N. (2014). Struktura soobshchestv i tsenopopulyatsiy Astragalus sericeocanus Gontsch. na poberezh'ye Baykala. Sib. ekol. zhurn. № 2, s.295-305.
6. Gupta, M., Chyi, Y., Romero-Severson, J., Owen, J. (1994). Am-plification of DNA markers from evolutionary diverse genomes using single primers of simple sequence re-peats. Theoret. Appl. Gen. V. 89, p.998-1006.
7. Nybom, H. (2004). Comparison of different nuclear DNA markers for estimating intraspecifi c genetic diversity in plants. Mol. Ecol. V. 13, p.1143-1155.
8. Harris, J. (1999). RAPDs in systematics – a useful methodology? P.M.Hollingsworth, R.M.Bateman, R.J.Gornall. Molecular systematics and Plant Evolution, p.221-228.
9. Esselman, E., Jianqiang, L., Crawford, D. (1999). Clonal diversity in the rare Calamgrostis porteri subsp. Insperata (Poaceae): comparative results for allozymes and random amplifi ed polymorphic DNA (RAPD) and intersimple sequence repeat (ISSR) markers. Mol. Ecol. V. 8, p.443-451.

10. Wolfe, A., Xiang, Q., Kephart, S. (1998). Assessing hybridiza-tion in natural populations of Penstemon (Scrophularia-ceae) using hypervariable intersimple sequence repeat (ISSR) bands. Ibid. V. 7, p.1107-1125.
11. Doyle, J. (1987). A rapid DNA isolation of fresh leaf tissue. Phytochemistry Bull. V. 19, p.11-15.
12. Frankel, O. (1974). Genetic conservation: our evolutionary responsibility. Genetics. V. 78, p.53-65
13. O'Hanlon, P., Peakall, R. (2000). A simple method for detection of size homoplasy among amplified fragment lengh polymorphism fragments. Mol. Ecol. V. 9, p.815-816.
14. Rossello, J., CebriAn, M., Mayol, M. (2002). Testing taxonomic and biogeographical relationship in a narrow Mediterranean endemic complex (Hippocrepis balearica) using RAPD markers. Ann. Bot. V. 89, p.321-327.
15. Nei, M., Li, W. (1979). Mathematical model for studying genetic variation in terms of restriction endonucleases. Proc. Nat. Acad. Sci. USA. 1979. V. 76, No. 10, p.5269-5273.
16. Schaal, B., Haywotth, D., Olsen, K. (1998). Phylogeographic studies in plants: problem and prospects. Mol. Ecol. V. 7, p.465-474.
17. Travis, S., Maschinski, J., Keim, P. (1996). An analysis of genetic variation in Astragalus cremnophylax var. Cremnophylax, a critically endangered plant, using AFLP markers. Mol. Ecol. V. 5, p.735-745.
18. Su, H., Qu, L., He, K. (2003). The Great Wall of China: a physical barrier to gene flow? Heredity. V. 90, p.212-219.

Göndərilib: 27.12.2023 Qəbul edilib: 18.02.2023

DOI: https://doi.org/10.36719/2707-1146/29/14-21

**Qafar Mahmud oğlu Məmmədov**
Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
aqrar elmlər üzrə fəlsəfə doktoru
mamadovqafar61@gmail.com
**Səfa Rza qızı Musayeva**
Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
ms815632@gmail.com
**Rasimə Rasim qızı Hüseynova**
Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
huseynovarasime123@gmail.com
**Ənfurə Telman qızı Məmmədova**
Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
memmedovasabina989@gmail.com
**Raya Rüstəm qızı Rüstəmova**
Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
mtelkom82@gmail.com
UOT: 638.22

# TUT İPƏKQURDU GENOFONDUNDA SAXLANILAN YERLİ CİNSLƏRİN BİOLOJİ GÖSTƏRİCİLƏRİNİN ÖYRƏNİLMƏSİ

**Xülasə**

Yeni cinslərin yaradılmasında tut ipəkqurdu genofondunun canlı kolleksiyasının böyük təcrübi əhəmiyyəti vardır. Tut ipəkqurdunun genofondu qorunub saxlanılmaqla yanaşı, həm də zənginləşdirilməlidir ki, seleksiyaçılar bundan lazımınca yararlana bilsin.

Hesabat ilində yerli və xarici olaraq 62 cinsin yaz yemləməsi aparılmış, bioloji göstəricilər təyin edilmiş, növbəti il üçün toxum materialı hazırlanmışdır.

Bioloji göstəriciləri öyrənməkdən ötrü 43 cinsin hər birindən 1 təkrarda 25 dişi və 25 erkək barama götürülərək əvvəlcə baramalar, sonra isə barama pərdəsi elektron tərəzidə ümumi çəkilmiş və sonra hesablama əsasında diri baramanın və barama pərdəsinin orta kütləsi, diri baramanın ipəkliliyi təyin olunub.

Elmi-tədqiqat işinin məqsədi genofondda olan yerli cinsləri saf halda saxlamaq, onların biotexnoloji göstəricilərini yaxşılaşdırmaqdır.

***Açar sözlər:*** *tut ipəkqurdu, cins, kolleksiya, genofond, zənginləşdirmə, barama, bioloji göstəricilər*

**Gafar Mahmud Mammadov**
Ministry of Agriculture of the Republic of Azerbaijan
Animal Husbandry Scientific Research Institute
Ph.D in Agricultural Sciences
mamadovqafar61@gmail.com
**Safa Rza Musayeva**
Ministry of Agriculture of the Republic of Azerbaijan
Animal Husbandry Scientific Research Institute
ms815632@gmail.com

**Rasima Rasim Huseynova**
Ministry of Agriculture of the Republic of Azerbaijan
Animal Husbandry Scientific Research Institute
huseynovarasime123@gmail.com
**Anfura Telman Mammadova**
Ministry of Agriculture of the Republic of Azerbaijan
Animal Husbandry Scientific Research Institute
memmedovasabina989@gmail.com
**Raya Rustam Rustamova**
Ministry of Agriculture of the Republic of Azerbaijan
Animal Husbandry Scientific Research Institute
mtelkom82@gmail.com
UOT: 638.22

# Study of biological indicators of local breeds preserved in the silkworm gene pool

## Abstract

The living collection of the silkworm gene pool is of great practical importance in the creation of new species. In addition to preserving the silkworm gene pool, it should also be enriched so that breeders can take full advantage of it.

In the reporting year, spring feeding of 62 breeds was carried out, biological indicators were determined, and seed material for the next year was procured.

İn order to study biological indicators, 25 female and 25 male cocoons are taken from each of 43 species in replication, first the cocoons and then the cocoon membrane were weighed on an electronic scale? And then the average mass of the live cocoon and the silkiness of the live cocoon were determined based on the calculation.

The purpose of the scientific research work is to keep the local breeds in the gene pool in a pure condition and to improve their biological indicators.

***Keywords:*** *mulberry silkworm, breed, collection, gene pool, enrichment, cocoon, biological indicators*

## Giriş

Dünyada genofondun qorunması, istər insan, heyvan, istərsə də bitki sahəsində böyük bəşəri bir problem olaraq insanların qarşısında durur, onların necə qorunması, gələcək nəsillərə saxlanması, ötürülməsi onları daim düşündürür. Dünya ölkələri tərəfindən genetik ehtiyyatların qorunması, saxlanması üçün bir sıra qərarlar, fərmanlar qəbul olunmuşdur. Belə bir fərman ümummilli liderimiz H.Ə.Əliyev tərəfindən imzalanmışdır. Fərmanın verilməsində əsas məqsəd Azərbaycan Respublikasında mövcud olan heyvan və bitki genofondunun qorunub saxlanması, yeni cins və sortların yaradılmasında elmi məqsədli, təyinatlı işlər aparılmasıdır. Ölkə genofondunun (heyvandarlıq və bitkiçilikdə) qorunub saxlanması çox böyük və məsuliyyətli bir işdir (Rozmetova, 1986: 3).

Genofondun gen bankın qorunub saxlanmasında Respublikanın aidiyyatı nazirlikləri, təşkilatları və müəssisələri qarşısında çox ciddi və mühüm vəzifələr qoyulmuşdur.

Mövcud olan cinslərin və sortların canlı kolleksiya şəklində saxlanılmasının, onların çox geniş çeşidinin olmasının böyük əhəmiyyəti var (Musayeva, 2022: 4).

Odur ki, məqsədimiz kolleksiyada olan cinsləri eksperimental sınaq əsasında hərtərəfli öyrənməklə aşkar etdiyimiz yararsız cinsləri çıxdaş etmək və yerdə qalan cinslərin saxlanılması işini səmərəli elmi-metodiki əsaslar üzərində qurmaqla onları seleksiya işlərində istifadə üçün yararlı vəziyyətə gətirməkdir.

Tut ipəkqurdunun cins daxili və ya təmiz cins çoxaldılması törədicilərin qohumluq əlaqəsindən asılı olaraq qohum (inbridinq) və qeyri-qohum ( aubridinq) çoxaldılmaya bölünür.

Tut ipəkqurdunun cinsi çoxaldılmasının 2 əsas metodu mövcuddur: cinsdaxili və cinsarası (çarpazlaşdırma və ya hibridləşdirmə). 1. cinsdaxili çoxaldılma (inbridinq, autbridinq). Tut ipəkqurdunun cinsdaxili və ya təmiz cins çoxaldılması törədicilərin qohumluq əlaqəsindən asılı olaraq qohum (inbridinq) və qeyri-qohum (autbridinq) çoxaldılmaya bölünür. İnbridinq bir-birilə qohumluq əlaqəsi olan fərdlərin cütləşdirilməsi yolu ilə nəsil alınmasına inbridiq deyilir (Azərbaycan Milli Elmlər Akademiyası Şəki Regional elmi mərkəzi, 2013: 355). Cütləşdirilən fərdlərin qohumluq dərəcəsi onların ümumi əcdadına qədər olan nəsllərin sayı ilə müəyyənləşdirilir. Birinci nəsldə ümumi valideyinə malik olan fərdlərin cütləşdirilməsinə sıx inbridinq və ya yaxın qohum çoxaldılması deyilir. Uzaq qohumluq əlaqəsi olan fərdlərin cütləşdirilməsinə isə inbridinq və qohum çoxaldılması deyilir. İnbridinq, yetişdirilmə metodu kimi, bir çox kənd təsərrüfatı heyvanlarının seleksiyasında geniş istifadə olunur. Xüsusən də, görkəmli göstəricilərə malik olan qiymətli fərdlərin irsi xüsusiyyətlərinin övlad nəsildə qorunub saxlanılması və möhkəmləndirilməsi üçün inbridinq ən kəsərli seleksiya metodu hesab olunur. İnbridinq isə cinsin, xüsusən də yeni yaradılmış cinsin sabitləşməsi prosesini sürətləndirir. İnbridinqin sıxlıq dərəcəsi inbridinq əmsalı ilə ifadə olunur. Müxtəlif növ heyvanların yetişdirilməsində inbridinq əmsalı nəsil almaq üçün istifadə olunan törədicilərin sayı 15 əsasında təyin olunur (Seyidov, 2012, 164). Cütləşdirilən dişi və erkək fərdlərin nisbəti təxminən 1:1 olduqda bir nəsil ərzində inbridinq əmsalı (Fx) aşağıdakı düsturla təyin:

$$F_x = \frac{1}{2N} \qquad (1.1)$$

Burada N - nəsil almaq üçün istifadə olunmuş törədicilərin sayıdır. Bir neçə nəsil qohum cütləşdirilməsindən sonra inbridinq əmsalı (Ft) aşağıdakı düsturla təyin olunur:

$$Ft = 1 – (1 - Fx)^t \qquad (1.2)$$

Burada t - nəsillərin sayıdır.

Yuxarıda göstərilən düsturlarda qohum cütləşməsinin tipini nəzərə almaq mümkün olmadığı üçün, onlar təxmini xarakter daşıyırlar. Doğrudur, inbridinq zamanı bu düsturlar kifayət qədər qənaətbəxş nəticələr verirlər, lakin sıx inbridinq zamanı bu düsturlarla təyin olunan inbridinq əmsalının qiyməti əhəmiyyətli dərəcədə təhrif olunur.

Yüksək məhsuldar tut ipəkqurdu cinslərinin yaradılması barama və xam ipək istehsalının artırılması üçün ən mühüm ehtiyat mənbəyidir (Hüseynova, 2020: 21).

Yeni tut ipəkqurdu cinslərinin yaradılmasında sintetik seleksiyadan geniş istifadə olunur və bu zaman hibrid seleksiya materialı əldə etmək üçün lazım olan valideyin cinslər əsasən canlı kolleksiyadan götürülür (Abbasov, 2004: 4). Aydın məsələdir ki, yeni cinslərin yaradılması üçün seleksiyaçıların sərəncamında geniş çeşiddə, müxtəlif faydalı xüsusiyyətlərə malik cinslər olmalıdır ki, onların içərisindən tələb olunan keyfiyyətlərə malik cinsləri seçmək mümkün olsun. Bu məsələnin ən düzgün və optimal yolu genetik ehtiyatlardan istifadə olunmasıdır.

Ümumiyyətlə, genetik ehtiyatların bitkilərin və heyvanların seleksiyasında rolu böyükdür. Təsadüfi deyildir ki, kənd təsərrüfatı bitkilərin və heyvanlarının genetik ehtiyatlarının (genofondunun) qorunub saxlanılması problemləri müxtəlif elmi məclislərdə dəfələrlə qaldırılmışdır (Həsənov, Sadiqov, 2004: 108-112)

Buna görə də, genofondun qorunub saxlanılmasına, öyrənilməsinə və praktiki seleksiyada istifadə olunmasına bitkiçilikdə və heyvandarlıqda ciddi diqqət yetirilir. Azərbaycanda da, genetik ehtiyatların qorunub saxlanılması həmişə diqqət mərkəzində olmuşdur (Abbasov, 2004: 4).

Tut ipəkqurdu genofondunun qorunub saxlanılması və yeni tut ipəkqurdu cinslərinin yaradılmasında aparılan seleksiya işlərində istifadə olunması və kolleksiyasa olan cinslərin eyni zamanda yaxşılaşdırılması həmişə əsas istiqamət kimi saxlanılır.

Genofondda olan müxtəlif mənşəli tut ipəkqurdu cinslərinin biotexnoloji göstəricilərinin öyrənilməsi, eyni zamanda həmin göstəricilərin daha da yaxşılaşdırılması işin elmi yeniliyi hesab olunur (Həsənov, 2012: 5). Praktiki əhəmiyyəti isə genofondun saxlanılması və cins yaradılmasında istifadə olunmasıdır (Məmmədov, Həsənova, Tağıyeva, Nəbiyeva, 2010: 5).

**Tədqiqatın material və metodikası:** Cari ilin yaz mövsümündə kümxana dezinfeksiya edildikdən sonra genofondda olan yerli cunslərin qrenası inkubasiya olunaraq dirildilmiş və respublikamızda qəbul olunmuş aqrozootexniki qaydalar əsasında bəslənilmişdir (Məmmədov, 2019: 201). Cinslərin qrenasının dirilməsini təyin etmək üçün inkubasiyaya hərəsində 200 qrena olan 3 nümunə qoyulub və kütləvi dirilmənin 3-cü günü dirilməmiş qrenalar sayılmışdır.

1 təkrar – 200 qurd

43 yerli cins – 43 x 200 = 8600

Cəmi: 8600 (qurd bəslənilib).

Bioloji göstəriciləri öyrənməkdən ötrü 43 cinsin hər birindən 1 təkrarda 25 dişi və 25 erkək barama götürülərək əvvəlcə baramalar, sonra isə barama pərdəsi elektron tərəzidə ümumi çəkilmiş və sonra hesablama əsasında diri baramanın və barama pərdəsinin orta kütləsi, diri baramanın ipəkliliyi təyin olunub.

Elmi-tədqiqat işinin məqsədi genofondda olan yerli cinsləri saf halda saxlamaq, onların biotexnoloji göstəricilərinin yaxşılaşdırmaqdır.

Bu məqsədlərə çatmaq üçün aşağısaki işlərin aparılması bir vəzifə kimi qarşıya qoyulur:

1.Yemləmə üçün hazırlıq işlərinin görülməsi.

2.Kümxananın təmizlənməsi və dezinfeksiyası.

3.Yaz yemləməsinin aparılması.

4.Növbəti il üçün cinslərin toxum materialının hazırlanması.

**Tədqiqat obyekti -** Heyvandarlıq ETİ-nun canlı kolleksiyasında saxlanılan 43 yerli tut ipəkqurdu cinsləridir.

Tədqiqat Heyvandarlıq ETİ-nun bazasında yerləşən kümxanalarda, Respublika ipəkçiliyində aparılan yemləmələr üçün qəbul olunmuş normal aqrozootexniki şəraitdə aparılır.

**Cədvəl 1.**
**Yerli cinslərin dirilmə faizi, %-lə**

| Sıra №-si | Cinsin adı | Başlama tarixi | | Dirilmə faizi |
|---|---|---|---|---|
| | | inkubasiya | yemləmə | |
| 1 | Agbaramalı 1 | 18.04 | 28.04 | 97,3 |
| 2 | Sultan | 18.04 | 28.04 | 97,2 |
| 3 | Azərbaycan | 18.04 | 28.04 | 97,6 |
| 4 | Azad | 18.04 | 28.04 | 96,7 |
| 5 | Aran | 18.04 | 28.04 | 95,6 |
| 6 | Gəncə- 2 | 18.04 | 28.04 | 97,2 |
| 7 | Gəncə-3 | 18.04 | 28.04 | 97,2 |
| 8 | AzNİİŞ-1 | 18.04 | 28.04 | 97,4 |
| 9 | Rəhimli 1 | 18.04 | 28.04 | 96,4 |
| 10 | Rəhimli 2 | 18.04 | 28.04 | 97,9 |
| 11 | Rəhimli 4 | 18.04 | 28.04 | 98,4 |
| 12 | Yaşar | 18.04 | 28.04 | 98,4 |
| 13 | Gəncə- 6 | 18.04 | 28.04 | 97,6 |
| 14 | Gəncə- 7 | 18.04 | 28.04 | 97,2 |
| 15 | Gəncə- 8 | 18.04 | 28.04 | 97,3 |
| 16 | Zəfər | 18.04 | 28.04 | 97,9 |
| 17 | Çinar | 18.04 | 28.04 | 97,4 |
| 18 | Murov | 18.04 | 28.04 | 96,4 |
| 19 | Qoşqar | 18.04 | 28.04 | 96,1 |
| 20 | Mayak- 1 | 18.04 | 28.04 | 96,6 |
| 21 | Mayak- 2 | 18.04 | 28.04 | 96,5 |
| 22 | Mayak- 3 | 18.04 | 28.04 | 96,4 |

| | | | | |
|---|---|---|---|---|
| 23 | Mayak -4 | 18.04 | 28.04 | 97,5 |
| 24 | Bəxtiyar | 18.04 | 28.04 | 97,1 |
| 25 | Mayak -6 | 18.04 | 28.04 | 95,5 |
| 26 | Qarabaq | 18.04 | 28.04 | 95,4 |
| 27 | Vətən | 18.04 | 28.04 | 95,4 |
| 28 | Qəbələ | 18.04 | 28.04 | 94,9 |
| 29 | Səngər | 18.04 | 28.04 | 94,9 |
| 30 | Qafqaz | 18.04 | 28.04 | 95,4 |
| 31 | Namazlı-1 | 18.04 | 28.04 | 96,7 |
| 32 | Namazlı-3 | 18.04 | 28.04 | 96,9 |
| 33 | Ugur | 18.04 | 28.04 | 96,4 |
| 34 | Xəyal | 18.04 | 28.04 | 94,8 |
| 35 | Ordubad -1 | 18.04 | 28.04 | 97,8 |
| 36 | Ordubad- 2 | 18.04 | 28.04 | 98,2 |
| 37 | ŞZEM-4 | 18.04 | 28.04 | 96,3 |
| 38 | GE-143 | 18.04 | 28.04 | 95,8 |
| 39 | GE-143x ŞZEM-4 | 18.04 | 28.04 | 95.9 |
| 40 | ŞZEM-4xGE-143 | 18.04 | 28.04 | 96,4 |
| 41 | Çinqiz | 18.04 | 28.04 | 97,3 |
| 42 | Muqan-1 | 18.04 | 28.04 | 98.5 |
| 43 | Muqan-2 | 18.04 | 28.04 | 98.0 |

Yaşama qabiliyyəti 3-cü yaşdan başlayaraq xəstə və ölmüş qurdların və pupların uçotu aparılmaqla, yemləmə müddəti isə yemləmənin başlanması, qurdların şaxa getməsinin başlanması və qurtarması tarixlərinin qeydiyyatı əsasında təyin olunub (Adıgözəlova, 2020: 160).



**Şəkil. Tut ipəkqurdu (III yaş)**

Sınaqdan keçirilən yerli cinslərin 3-cü yaşın 1-ci günündən qurdları (8600 qurd) sayılıb hər birindən 200 qurd olmaqla yemləməsi aparılmış və lazım olan bioloji göstəriciləri öyrənilmişdir. Bioloji göstəriciləri öyrənməkdən ötrü 43 cinsin hər birindən 1 təkrarda 25 dişi və 25 erkək barama götürülərək əvvəlcə baramalar, sonra isə barama pərdəsi elektron tərəzidə ümumi çəkilərək, hesablama əsasında diri baramanın və barama pərdəsinin orta kütləsi, diri baramanın ipəkliliyi təyin olunmuşdur (Mamedov, 1995: 144-147).

**Cədvəl 2.**
**Yerli cinslərin bioloji göstəriciləri**

| №-si | Cinsin adı | Qurdun | | Orta kütləsi | | Diri baramanın ipəkliliyi, % |
|---|---|---|---|---|---|---|
| | | Yemləmə müddəti, sutka | Yaşama qabiliyyət, % | Diri baramanın Q | Barama pərdəsinin, mq | |
| 1 | 2 | 4 | 5 | 6 | 7 | 8 |
| 1 | Agbaramalı - 1 | 29 | 97,3 | 1,80 | 420 | 23.3 |
| 2 | Sultan | 29 | 97,5 | 1,55 | 340 | 21,9 |
| 3 | Azərbaycan | 29 | 97,6 | 1,88 | 390 | 20,6 |
| 4 | Azad | 29 | 98,7 | 1,55 | 390 | 20,6 |
| 5 | Aran | 29 | 98,6 | 1,93 | 430 | 25,3 |
| 6 | Gəncə - 2 | 29 | 97,2 | 1,67 | 300 | 17,9 |
| 7 | Gəncə -3 | 29 | 97,4 | 1,71 | 330 | 19,3 |
| 8 | AzNİİŞ - 1 | 29 | 98,4 | 1,90 | 450 | 23,9 |
| 9 | Rəhimli 1 | 29 | 98,4 | 1,90 | 450 | 20,8 |
| 10 | Rəhimli 2 | 29 | 97,6 | 1,92 | 400 | 20,9 |
| 11 | Rəhimli 4 | 29 | 97,2 | 1,67 | 410 | 24,5 |
| 12 | Yaşar | 29 | 97,3 | 1,92 | 420 | 21,8 |
| 13 | Gəncə- 6 | 29 | 97,1 | 1,99 | 460 | 23,1 |
| 14 | Gəncə- 7 | 29 | 95,5 | 1,67 | 320 | 19,7 |
| 15 | Gəncə- 8 | 29 | 97,5 | 1,79 | 330 | 18,3 |
| 16 | Zəfər | 29 | 98,0 | 1,88 | 410 | 21,8 |
| 17 | Çinar | 29 | 94,9 | 1,75 | 380 | 21,7 |
| 18 | Murov | 29 | 95,4 | 1.55 | 310 | 20,0 |
| 19 | Qoşqar | 29 | 95,7 | 1,87 | 460 | 24,6 |
| 20 | Mayak - 1 | 29 | 95,7 | 1,52 | 340 | 22,4 |
| 21 | Mayak - 2 | 29 | 96,4 | 1.96 | 440 | 22,4 |
| 22 | Mayak - 3 | 29 | 94,8 | 1,83 | 400 | 21,8 |
| 23 | Mayak - 4 | 29 | 94,9 | 1,93 | 320 | 16,6 |
| 24 | Bəxtiyar | 29 | 95,4 | 1,07 | 380 | 18,7 |
| 25 | Mayak - 6 | 29 | 97,5 | 1,59 | 360 | 22,6 |
| 26 | Qarabaq | 29 | 96,7 | 1,06 | 430 | 20,8 |
| 27 | Vətən | 29 | 99,5 | 1,81 | 340 | 18,9 |
| 28 | Qəbələ | 29 | 97,5 | 1,53 | 340 | 17,0 |
| 29 | Səngər | 29 | 97,4 | 1,67 | 410 | 24,5 |
| 30 | Qafqaz | 29 | 97,4 | 1,84 | 430 | 23,4 |
| 31 | Namazlı - 1 | 29 | 97,0 | 1,64 | 400 | 24,3 |
| 32 | Namazlı - 3 | 29 | 96,5 | 1,59 | 390 | 23,6 |
| 33 | Ugur | 29 | 96,5 | 1,73 | 430 | 24,8 |
| 34 | Xəyal | 29 | 97,0 | 1,88 | 430 | 23,0 |
| 35 | Ordubad -1 | 29 | 96,5 | 1,65 | 435 | 24,5 |
| 36 | Ordubad- 2 | 29 | 96,0 | 1,74 | 485 | 25,0 |
| 37 | ŞZEM-4 | 29 | 95,0 | 1.61 | 380 | 23,6 |
| 38 | GE-143 | 29 | 96,5 | 1,71 | 420 | 24,5 |
| 39 | GE-143x ŞZEM-4 | 29 | 97,5 | 1,83 | 380 | 20,7 |
| 40 | ŞZEM-4xGE-143 | 29 | 97,0 | 1,89 | 400 | 21,6 |
| 41 | Çinqiz | 29 | 96,5 | 1,78 | 330 | 18,5 |
| 42 | Muqan-1 | 29 | 98,0 | 2,05 | 480 | 23,4 |
| 43 | Muqan-2 | 29 | 97,5 | 2,0 | 473 | 23,7 |

Qrenanin dirilmə faizinə görə ən yüksək göctəricilər Muğan-1 (98,5%), Ordubad-2 (98,2%), Muğan-2 (98,0%) cinsləri göstərilmişdir.

Yaşama qabiliyyəti 3-cü yaşdan başlayaraq xəstə və ölmüş qurdların və pupların uçotu aparılmaqla, yemləmə müddəti isə yemləmənin başlanması, qurdların şaxa getməsinin başlanması və qurtarması tarixlərinin qeydiyyatı əsasında təyin olunub.

1 diri (yaş) baramanın orta kütləsi görə ən yüksək göstərici Mugan-1 (2,05q), Mugan-2 (2,0q), Gəncə-6 (1,99q).

Barama pərdəsinin kütəsinə görə ən yüksək göstəricilər Ordubad-2 (485 mq), Mugan-1 (480 mq), Gəncə-6 (460 mq)-dır.

Diri baramanin ipəkliliyinə görə ən yüksək göstəriciləri Aran cinsi (25,3%), Ordubad-2 (25,0%), Ugur (24,8%) cinsləri göstərmişdir.

Metodika hissəsində qeyd olundugu kimi hal-hazırda Heyvandarlıq Elmi-Tədqiqat İnstitutunun Tut ipəkqurdunun seleksiyası laboratoriyasının genofondunda 62 cins saxlanılır. Bunlardan 43 yerli, 19 isə xarici cinslərdir. Cinslər eyni otaq şəraitində, Azərbaycan Respublikası ipəkçiliyi üçün tövsiyə olunmuş (1975-ci il) aqrozootexniki qaydalara (təlimata) uyğun inkubasiyaya qoyulmuş və hər cinsin 3 təkrarda və hər təkrarda 200 qrena olmaqla dirilmə faizi və cinslərin boiloji göstəriciləri cədvəldə verilmişdir.

## Nəticə

1. Baramaların bioloji göstəriciləri hesablanmış;
2. Növbəti il üçün hər cinsin toxum materialı hazırlanmış;
3. Xəstə düzümlər çıxdaş edilmişdir;
4. Toxumların estivasiya dövrü başa catana qədər onlar təlimata uyğun olaraq istilik və rütubət rejiminə əməl olunmaqla saxlanılıb və qışlama dövrü üçün soyuducuya qoyulmuşdur.

## Ədəbiyyat

1. Rozmetova, M. (1986). Porody tutovogo shelkopryada v kollektsii SANIISH. Trudy SANIISH, vyp. 20, s.9-10.
2. Musayeva, S., Hüseynova, R. (2022). Cinsiyyətindən asılı olaraq tut ipəkqurdunun əsas bioloji göstəricilərinin öyrənilməsi. “Təbiət və Elm” beynəlxalq elmi jurnal. Bakı, s.45-49.
3. Azərbaycan Milli Elmlər Akademiyası Şəki Regional Elmi mərkəzi. (2013). “İpəkçilik”. İzahlı lüğət. Bakı, 355 s.
4. Seyidov, A., Abbasov, B. (2012). İpəkçiliyin əsasları. Dərslik. Bakı: “Müəllim” nəşriyyatı, 164 s.
5. Hüseynova, R., Musayeva, S. (2020). Tut ipəkqurdlarının bəslənilməsi qaydalar. Tövsiyyə. Göygöl, 21 s.
6. Abbasov, B., Hacıyeva, Z., Verdiyeva, S., Qədimova, Q. (2004). Azərbaycanda tut ipəkqurdu genofondunun öyrənilməsi. I xəbər. Yerli kolleksiya cinslərinin morfoloji təsviri və bioloji göstəriciləri. AzETİİ-nin Elmi əsərləri. XVI c., s.7-11.
7. Həsənov, V., Sadiqov, Ə. (2004). Müxtəlif ölkələrdə yaradılmış tut sortlarının kolleksiyada öyrənilməsinin nəticələri. AzETİİ-nin Elmi əsərləri. XVI c., s.108-112.
8. Abbasov, B., Hacıyeva, Z., Verdiyeva, S., Qədimova, Q. (2004). Azərbaycanda tut ipəkqurdu genofondunun öyrənilməsi. II xəbər. Xarici mənşəli kolleksiya cinslərinin morfoloji təsviri və bioloji göstəriciləri. AzETİİ-nin Elmi əsərləri, XVI c., s.11-15.
9. Həsənov, N., Qocayeva, S., Əliyeva, V. (2012). İpəkçilik İnstitutunun genofondunda saxlanılan tut ipəkqurdu cinslərinin əsas bioloji göstəriciləri. AzETİİ-nin Elmi əsərləri. XIX c., s.50-55.
10. Məmmədov, Q., Həsənova, E., Tağıyeva, Ş., Nəbiyeva, N. (2010). Müxtəlif istilik və nisbi rütubətin tut ipəkqurdu cins və hibridlərinin bioloji və məhsuldarlıq göstəricilərinə təsiri. Az. ETİİ-nin Elmi Xəbərləri məcmuəsi. Gəncə, s.55-65
11. Məmmədov, Q. (2019). “İpəkçilərin məlumat kitabı. 201 s.
12. Adıgözəlova, D. (2020). “Tut ipəkqurdunun bəslənilməsi qaydaları”. Gəncə, 160 s.

DOI: https://doi.org/10.36719/2707-1146/29/22-27

**Leylabəyim Mirməmməd qızı Seyidova**
Naxçıvan Dövlət Universiteti
dissertant
leylaseyidova2012@gmail.com

# NAXÇIVAN MUXTAR RESPUBLİKASI ƏRAZİSİNDƏ ENTODİNİMORPHA DƏSTƏSİNƏ AİD OLAN NÖVLƏRİN FAUNASI VƏ EKOLOGİYASININ ÖYRƏNİLMƏSİ

**Xülasə**

Məqalədə Naxçıvan Muxtar Respublikası ərazisində entodinimorpha dəstəsinə aid olan infuzorlar öyrənilmişdir. Tədqiqat obyekti gövşəyən heyvanlardan qoyunlar olmuşdur. Mütəmadi olaraq qoyunlarda tədqiqat aparılaraq infuzor növlərinin təsir xüsusiyyətləri öyrənilmişdir. Müəyyən edilmişdir ki, faunasız gövşəyənlərlə müqayisədə kirpikli protozoaların olması ruminal qıcqırmanın daha sabit olmasına, ammonyakın yüksək səviyyəsinə, bakteriyaların sayının azalmasına, həmçinin quru maddənin (%), mayenin həcminin və ruminal tərkibinin dövriyyə sürətinin dəyişməsinə səbəb olur.

***Açar sözlər:*** *entodinimorph, rumen mayesi, infuzor, avtoklav, növ*

**Leylabayim Mirmammad Seyidova**
Nakhchivan State University
dissertatist
leylaseyidova2012@gmail.com

## Study of fauna and ecology of species belonging to entodynimorpha in the territory of the Nakhchivan Autonomous Republic

**Abstract**

In the article, the infusors belonging to the order of Entodinimorpha were studied in the territory of the Nakhchivan Autonomous Republic. The research object was sheep from ruminant animals. The effects of infusor species have been regularly studied in sheep. It has been determined that the presence of ciliated protozoa leads to a more stable ruminal fermentation, a high level of ammonia, a decrease in the number of bacteria, as well as the change in the turnover rate of dry matter (%), liquid volume and it causes ruminal content, compared to ruminants without fauna.

***Keywords:*** *entodinimorph, rumen fluid, infusor, autoclave, species*

## Giriş

Protozoalar birhüceyrəli heyvanlardır. Onların 50.000-dən çox növü təsvir edilmişdir və əksəriyyəti sərbəst yaşayan orqanizmlərdir. Protozoalar demək olar ki, bütün mümkün yaşayış yerlərində rast gəlinir. Çöküntü süxurlarındakı qabıqlar şəklində olan fosil qeydləri, protozoaların Kembridən əvvəlki dövrdə mövcud olduğunu göstərir. Anton van Levenhuk sadə linzalarla qurduğu mikroskoplardan istifadə edərək protozoaları görən ilk insan idi. 1674-1716-cı illər arasında o, sərbəst yaşayan protozoadan əlavə, bir neçə parazitar növləridə qeyd etmişdir (Alekberov, 2012: 520). İnfuzorlar arasında parazitlik edən növlər çoxdur ki, onlarda müxtəlifdir. Bunlardan Entodiniomorpha dəstəsinə aid olan 120-yə qədər növ gövşəyən heyvanların mədəsində yaşayırlar. Parazitlik edən bu infuzorların çoxunun sahibin orqanizmində həzm prosesinin gedişinə müsbət təsiri vardır (Ağamalıyev, Quliyeva, 2011: 471). Beləki, qoyunlarda yemin həzm olunması mikroorqanizmlərin həyat fəaliyyətindən asılıdır. Həzm sistemində üç formada yemin həzmi baş verir: mexaniki, mikrobioloji və kimyəvi. Yem ağızda xırdalanır, tüpürcəklə isladılaraq udulur. Bu tamamilə mexaniki proses olub, bu zaman yem heç bir fermentativ prosesə məruz qalmır,lakin

tüpürcəklə islanmış yem reaksiyalı olur və onda sidik cövhəri və fosforun olması ilə əlaqədar olaraq işkənbədə mikroorqanizmlərin yaşayıb, fəliyyət göstərməsinə əlverişli şərait yaradır (Abdullayev, Əliyev, 2014: 451). Qoyunların işkənbəsində çox miqdarda bakteriya və ibtidailər yaşayıb qidalanırlar. Tədqiqatlarla məlum olunmuşdur ki, 1 q işkənbə mötəviyyatında 1 milyondan çox infuzor vardır. Bunların köməyi olmazsa qoyunlar sadə qeyri zülal birləşmələri ilə sellülozanı mənimsəyə bilməzdilər. İşkənbədə yerləşən bu mikroorqanizmlər yemdəki üzvi maddələri parçalayaraq uçan yağ turşuları, ammonyak, amin turşuları əmələ gətirirlər ki, bundan da heyvanlar özünün inkişafı və doğub törəməsi üçün istifadə edir. Qoyunlar həmçinin sadə azotlu birləşmə olan sidik cövhərindən və ammonium duzlarından yaxşı istifadə edirlər. Həzm sistemindən keçərkən bu mikroorqanizmlər həzm olunurlar, onların bədənlərində olan, əsasən də zülallar, qoyunun yediyi yemi zənginləşdirir (Veysig, 1940: 336). Beləliklə, həzm olunan mikroorqanizmlərin bədənindəki zülallar yüksək bioloji qidalılığa malik olmaqla, qoyunların əvəzolunmaz amin turşularına olan tələbatı əsasən ödəyir. Sidik cövhəri qatılmış yem rasionunda işkənbə mikroflorası 10 əvəzolunmaz amin turşusu sintez edir. Qoyunlar ən çox qaba yemdən istifadə edirlər ki, bu yemlər sellüloza ilə zəngindir. Yemin tərkibindəki sellüloza mədədə mikroorqanizmlərin fermentativ fəaliyyəti nəticəsində həzm olunur. Mikroorqanizmlər ən çox işkənbədə olduğu üçün 100% həzm olunan sellülozanın 70%-i bu sahənin payına düşür. Mikroorqanizmlər sellülozanın hemi sellülozaya, nişastaya, şəkərə, pektin maddələrinə qədər parçalayıb, azotlu birləşmələrin təbiətini dəyişərək, mikrob zülalı və B və K qrupu vitaminləri sintez olunur (Abdullayev, Əliyev, 2012: 331).

Kirpikli protozoaların ruminal ekosistemə təsiri, bağırsağın müxtəlif hissələrində həzm, udulmaq üçün mövcud olan qida maddələrinin təbiəti və onların ev sahibinin qidalanmasına və məhsuldarlığına təsirləri nəzərdən keçirilir. Faunasız gövşəyənlərlə müqayisədə kirpikli protozoaların olması ruminal qıcqırmanın daha stabil olmasına, ammonyakın yüksək səviyyəsinə, bakteriyaların sayının azalmasına, həmçinin quru maddənin (%), mayenin həcminin və ruminal tərkibinin dövriyyə sürətinin dəyişməsinə səbəb olur. Rumendəki bu fərqlərlə əlaqəli heyvanlarda daha yüksək ruminal üzvi maddələrin və lifin ümumi həzm olunmasıdır. Xalis mikrob sintezinin azalması və rumendə qida zülalının deqradasiyasının artması faunalı gövşəyən heyvanlarda zülalın nazik bağırsağa axınının aşağı olması ilə nəticələnir. Kirpikli protozoaların əsas qidalanma təsiri, udulmuş qida maddələrində zülalın enerjiyə nisbətini dəyişdirməkdir, faunalaşmış heyvanlar kirpiksiz gövşəyənlərlə müqayisədə daha az protein və daha yüksək enerjiyə malikdir. Rumendə kirpikli protozoa növlərinin manipulyasiyasının heyvan performansını yaxşılaşdıra biləcəyini müəyyən etmək qalır (6).

## Tədqiqatin materiali və metodikasi

Tədqiqat obyekti gövşəyən heyvanlardan qoyunlar olmuşdur. Mütəmadi olaraq qoyunlarda tədqiqat aparılaraq infuzor növlərinin təsir xüsusiyyətləri öyrənilmişdir. Bunun üçün standart mühit 20 ml-dən ibarət idi, avtoklavda (20 dəqiqə ərzində 115°) mineral duz məhlulu; 4ml 5% $NaHCO_3$ (avtoklavlanmış suda təzə hazırlanmışdır); 0·6ml 1%-li sistein HCl (istifadədən dərhal əvvəl zərərsizləşdirilir); 1·0ml sulu 1·5% “daş üyüdülmüş” kəpək unu; 3 ml avtoklavlanmış rumen mayesi; 5mq qurudulmuş ot; 50 ml-də sentrifuqa borusu. Növlərin dəqiqləşdirilməsində bir sıra əbədiyyatlardan və digər çox saylı təyinedicilərdən istifadə edilmişdir.

## Tədqiqatin müzakirəsi və nəticələr

Naxçıvan Muxtar respublikası ərazisində dırnaqlı heyvanların bağırsaq yolunda yaşayan böyük bir dəstənin Ophryoscolcidae fəsiləsinə mənsub ola protozoa növləri öyrənilmişdir. Bunun üçün protozoologiya tədqiqatında, model protozoa növlərinin aksenik mədəniyyətlərinin yaradılması üçün ilk səy göstərildi. Mikroorqanizmlərin təmiz kulturaları 20-ci əsrin sonuna qədər mikrobioloji təcrübələr üçün qızıl standart idi və mikrob metabolizmi, fiziologiyası və ekologiyası ilə bağlı mövcud biliklərin əksəriyyəti mikroorqanizmlərin təmiz kulturalarından istifadə edilən tədqiqatlardan əldə edilmişdir (Jouany, Ushida 1999: 113-28). Müasir mikrob texnologiyaları mikrobların birbaşa tədqiqinə imkan versədə, təmiz mədəniyyətlər hələ də ayrı-ayrı mikrobların

yuvasında ifadə olunan fiziologiya və maddələr mübadiləsini aydınlaşdırmağa imkan verir və ya ən azı asanlaşdırır. Buna görə də, ənənəvi mikrobioloji tədqiqatlarda ilkin səy, ətraflı tədqiqatlar üçün təmiz mədəniyyətlər əldə etməkdir (Park, 2018: 186-93).

Kirpikli ibtidailər bütün vəhşi və əhliləşdirilmiş gövşəyən heyvanlarda mövcuddur. Rumen kirpikli protozoa cavan gövşəyən heyvanlar tərəfindən birbaşa yetkin heyvanlardan və ya bu cür heyvanların tüpürcəyi ilə çirklənmiş qidaları yeməklə əldə edilir. Rumen protozoa fibrolitik fəaliyyəti məhşurdur, lakin fermentativ fəaliyyətin çoxu yalnız defunasiya təcrübələri ilə yaxud bakteriya və göbələklərlə qarışıq in vitro təcrübələrdə əldə edilmişdir. Entodiniomorphid protozoa bir neçə dəfə in vitroda uğurla yetişdirilmişdir, lakin populyasiya sıxlığı adətən aşağı olmuşdur (Coleman, 1958:1104). Gutierrez və Davis Epidinium ecaudatum-u 5 ay ərzində in vitro becərmişlər, lakin cəmi 1200/ ml populyasiya əldə etmişlər. Eremoplastron bovisi-i 5 ay qeyri-müəyyən sayda və qarışıq entodiniomorfları bir qədər uzun müddət saxladı, Mah isə 1000-ə qədər Ophryoscolex purkynei saxladı. Polyplastron multivesiculatum, Endiplodium negletum, Anoplodinium denticulatum saxlanıldı (Mah, 1964: 546). Sonra Jarvis və Hungate üyüdülmüş buğda və ot mühitində qeyri-müəyyən bir müddət ərzində hər 24 saatdan bir bölünən *Entodinium simplex*-i saxlamışdır. Əvvəlcə protozoa ot və yulafla qidalanan qoyunların rumen tərkibindən hazırlanmışdır. Bunun üçün rumen mayesi qidalanmadan 6 saat sonra götürüllür və daha böyük qida hissəciklərini çıxarmaq üçün bir qat muslin vasitəsilə süzülür. Daha sonra mayenin 8×1 düym (20×2·5sm) boruda 39° temperaturda 2 saat dayanır ki, daha böyük protozoa borunun dibinə düşsün. Borunun yuxarı hissəsindən maye daha sonra 600q-da təxminən 3 dəqiqə sentrifuqa edilir və ya supernatant mayenin bir damcısında *Entodinium simplex* mövcud olana kimi yeganə kirpikli protozoon görünənə qədər mikroskopik müayinə edilir. Kəpək unu düyü nişastası və yuyulmuş kəpək qarışığı ilə əvəz edilə bilər, lakin hər ikisi ayrıca deyil. Entodinium simplex ilkin təcrid edilməsi kəpək unundan karbohidrat mənbəyi kimi istifadə edilsədə, sonradan düyü nişastası+ yuyulmuş kəpək qarışığının xüsusilə bu mühitə uyğunlaşmada bir neçə həftə sonra daha yaxşı böyümə verdiyi aşkar edilmişdir. Bu qarışığın mövcudluğunda populyasiya sıxlığı 60.000 protozoa/ml-dən çox əldə edilmişdir. Buğda nişastası dənələrinin çoxu E.simplex tərəfindən udulmaq üçün çox böyük olduğundan və mədəniyyətlərdəki bakteriyalar tərəfindən fermentləşdirilmiş olmalıdır, düyü nişastasının müvəffəqiyyətlə istifadəsi, ehtimal ki, protozoa tərəfindən onun tam istifadəsi ilə əlaqəlidir. Bu mədəniyyətlərdə kəpəyin rolu qeyri-müəyyəndir, lakin o, nişastada və ya mədəniyyətlərdə yaşayan bakteriyalarda olmayan bəzi material, ehtimal ki, böyümə faktorunu təmin etməlidir. Sübutlar nəticəsində əldə edilmişdir ki, böyümə üçün vacib olan rumen mayesindəki hissəciklərdir (Dawson, Hemington, 1974: 327-340).

Müxtəlif nişastalar, kəpək və steril rumen maye fraksiyalarının Entodinium simplex-in saxlanmasına təsiri. Təcrübə 50 ml-də anaerob üsulla aparılmışdır. 20 ml olan sentrifuqa boruları, orta duzlar, 4 ml. 5% $NaHCO_3$, 0·6 ml. 1%- sistein hidroxlorid və aşağıda göstərilən əlavələr, $CO_2$ ilə tarazlaşdırılmışdır. Mədəniyyətlər həftədə iki dəfə bərabər həcmdə təzə un, nişasta və ya yuyulmuş kəpək əlavə edildi. Təcrübə standart mühitdə yetişdirilmiş kultura ilə başlanmış və göstərilən mühitdə 3 həftə ərzində baxımdan sonra protozoaların sayı aşağıdakı cədvəldə hesablanmışdır (Cədvəl 1).

**Cədvəl 1.**

| Gündəlik karbohidrat əlavəsi lavəsi (mq./ml.orta) | Rumen maye hissəsi əlavə edildi (10%) | Protozoa sayı/ml. mədəniyyət |
|---|---|---|
| **A** | Avtoklavlanmış rumen mayesi (ARF) | |
| 0·5 kəpək unu | | 26,900 |
| 0·5 kəpək unu, 0·6 kəpək | | 36,600 |
| 0·5 kəpək unu, 0·6 yuyulmuş kəpək | | 36,300 |
| 0·25 düyü nişastası | | 6100 |
| 0·25 düyü nişastası, 0·6 yuyulmuş kəpək | | 30,400 |

| | | |
|---|---|---|
| 0·25 buğda nişastası | | 600 |
| 0·25 buğda nişastası, 0·6 yuyulmuş kəpək | | 8400 |
| 0·6 kəpək | | 3900 |
| 0·6 yuyulmuş kəpək | | 1100 |
| **B** | | |
| 0·5 kəpək unu | Heç biri | 3700 |
| | AS* | 16,700 |
| | PARF± | 25000 |
| | ARF± | 29400 |
| | AB§ | 33000 |
| *AS=rumen mayesi sentrifuqalanmış 10,000 q supernatant, avtoklavlanmış.<br>+PARF=bütün rumen mayesi, avtoklavlanmış<br>++ARF=yüngül sentrifuqalanmış rumen mayesi, avtoklavlanmış.<br>§AB= AS-dən 10000 q sentrifuqalanmış qranul, avtoklavlanmış= avtoklavlanmış bakteriyalar | | |

Cədvəldən göründüyü kimi kəpək unu 0·25, 0·5 və ya 0·1 mq/ml yekun konsentrasiyaya qədər kəpək ununun gündəlik əlavə edilməsi müvafiq olaraq populyasiya sayının artması ilə nəticələndi. Entodinium simplex kəpək ununda kiçik taxıllarda yaşayır, lakin düyü nişastası və digər nişastaların iştirakı ilə ölürdü, çünki taxıllar onu udmaq üçün çox böyük idi (11). Bu fərziyyə *E. Simplex*-in düyü nişastası taxıllarını udmaq iqtidarında olmadığını bildirən Sugdenin müşahidələri ilə dəstəkləndi və onların götürə bilməyəcək qədər böyük olduğu qənaətinə gəldi.

Təcrübə standart şəraitdə kəpək ununun buraxıldığı mühitdə aparılmışdır. Yuyulmuş kəpəyin təsirinə dair təcrübələr üçün 0·25 mq düyü nişastası/ml gündəlik əlavə edildi və düyü nişastasının təsiri olanlar üçün 0·6 mq yuyulmuş kəpək/ml hər gün əlavə olunurdu.




Gündəlik əlavə edilən düyü nişastası və ya yuyulmuş kəpək miqdarının *Entodinium simplex*-in sabit populyasiyasına təsiri.

Kəpəkdəki əsas amillərin mühitdə 24 saatdan çox qaldığını müəyyən etmək üçün aşağıdakı təcrübə aparıldı. 0·25 mq iştirakı ilə düyü nişastası/ml gündəlik, sonrakı əlavə gündəlik 0·6 mq yuyulmuş kəpək/ml protozoaların sayını 6000-dən 61000/ml-ə qədər artırdı. Yuyulmuş kəpəyə iki gündən bir və ya həftədə iki dəfə əlavə olunduqda sıxlıq müvafiq olaraq 36300 və 30800/ml azalıb. Hər gün iki dəfə çox miqdarda yuyulmuş kəpək əlavə edilməsi bu rəqəmi cəmi 40200/ml-ə çatdırdı, bu da yuyulmuş kəpəkdə bəzi vacib amilin yalnız hər gün əlavə edildikdə mövcud olduğunu göstərir (Coleman, 1958).

*Entodinium simplex-in* q idalanması, həmçinin aqnotobiotik kulturalarda substrat kimi çoxillik çovdar və buğda dənələri ilə tədqiq edilmişdir. Substratların avtoklavlanması zamanı entodinium zəif böyüdü, substratlar etilen oksid buxarı ilə sterilizasiya edildikdə daha yaxşı böyümə əldə edilmişdir. Etilen oksidin konsentrasiyası və rütubətin miqdarı müalicə olunan substratın sterilliyinə və qidalanma adekvatlığına təsir göstərmişdir. Qarışıq rumen protozoalarının avtolizatları və hidrolizatları böyüməyi stimullaşdırdı. Protozoal ekstraktlar avtoklavla məhv edilən amilləri əvəz etmədi. Təmizlənmiş rumen mayesi kiçik inokulalardan entodiniyanın becərilməsinə kömək etdi, lakin qurulmuş mədəniyyətlər üçün zərərli idi. Kulturaların uğuruna inokulumu yetişdirmək üçün istifadə olunan mühit, eləcə də aşılanmış mühit təsir göstərirdi. Nəticələr göstərdi ki, bakteriya populyasiyasının tərkibi *E. simplex*-in böyüməsinə təsir göstərir (13).

Rumen substratların və yırtıcıların, zəngin və ardıcıl mövcudluğu, sabit temperatur və pH-ın olması səbəbindən anaerob kirpiklər üçün dəbdəbəli bir mühitdir. Bu transkriptomik tədqiqat ümumi rumen kirpikli növlərdən olan *E.caudatumun* bir çox mühüm xüsusiyyətlərini aşkar etdi. Rumendə onun maddələr mübadiləsi və həyat tərzi ilə bağlı bəzi xüsusiyyətlər, gövşəyən heyvanlarda struktur polisaxaridlərin, azot mübadiləsinin və azotun istifadəsinin səmərəliliyi müzakirə edilir. Bəzi xüsusiyyətlər *E. caudatumun* yuvasını və uyğunluğunu anlamağa kömək edir.

Tədqiqat zamanı *Entodinium caudatumun* in vitroda subakut ruminal asidozun qarşısının alınmasının təsirini qiymətləndirildi. Buğda və qarğıdalının müxtəlif nisbətləri [100% buğda (W); 75% buğda və 25% qarğıdalı (W75); 50% buğda və 50% qarğıdalı (WC); 75% qarğıdalı və 25% buğda (C75); və 100% qarğıdalı (C)] in vitro asidotik mühit yaratmaq üçün istifadə edilmişdir. *E. caudatumun*-un fəaliyyəti substratlara defunasiya edilmiş rumen mayesinin və protozoa monokulturalarının əlavə edilməsi ilə müəyyən edilmişdir. *E. caudatum* monokulturasının pH-a təsiri cüzi idi, ammonyak əmələ gəlməsinə taxıl növünün əhəmiyyətli təsiri müşahidə edildi. *E.caudatum* peyvənd bütün inkubasiya dövrü ərzində laktik turşu konsentrasiyasını azaldıb və fermentasiya başlama vaxtını qısaldıb. Buğda nisbəti ilə artan xüsusi fermentasiya dərəcəsi (SFR), *E. caudatum* mədəniyyəti ilə azaldıldı.Ümumi qaz hasilatı substratdan asılı olaraq dəyişdi və *E. caudatum* tərəfindən artırıldı. Protozoa monokultura propion turşusunun səviyyəsini azaldarkən, metan istehsalını artırıldı. Nəticədə, *E. caudatum* əvvəllər fermentasiyanı stimullaşdırdı, lakin SFR-ni azaltmaqla laktik turşu istehsalını azaldıb. *E. caudatumun* ani faqositozuna nişasta hissəciklərini həzm etmək üçün rumen mayesində sürətli bakterial fermentasiyanın qarşısını alır və bununla da laktik turşu istehsalını məhdudlaşdırır (14).

## Nəticə

1. Aparılmış tədqiqat nəticəsində müəyyən edilmişdir ki, faunasız gövşəyənlərlə müqayisədə kirpikli protozoaların olması ruminal qıcqırmanın daha sabit olmasına,yemin həzminə, pəhriz azotundan istifadənin səmərəliliyinin müəyyən edilməsinə, tullantıların azot və metan qazı kimi çıxarılmasına, ammonyakın yüksək səviyyəsinə,bakteriyaların sayının azalmasına, həmçinin quru maddənin (%), mayenin həcminin və ruminal tərkibinin dövriyyə sürətinin dəyişməsinə səbəb olur.

2. Müəyyən edilmişdir ki, ayrı-ayrı kirpiklilərin (*Entodinium caudatumun, Entodinium simplex*) ruminal fermentasiyaya təsir fərqlidir və bu növlər birləşdikdə bəzən fərqli şəkildə təsir göstərir ki, bununlada həzm olunan mikroorqanizmlərin bədənindəki zülallar yüksək bioloji qidalılığa malik olmaqla, qoyunların əvəzolunmaz amin turşularına olan tələbatını ödəyir.

## Ədəbiyyat

1. Alekberov, I. (2012). Svobodnojivushie infuzorii Azerbaydjana (ekologiya, oogeografiya, prakticheskoe znachenie). Baku: Elm, 520 s.
2. Ağamalıyev, F., Quliyeva, F. (2011). Onurğasızlar zoologiyası. Bakı: BDU, 471 s.
3. Abdullayev, Q., Əliyev, M. (2014). Qoyunçuluq. Bakı: Yazıçı, 451 s.
4. Veysig, S. (1940). Materialy po mikroskopicheskoy gidrofaune Kavkaza i ee zoogeograficheskomu analizu. Dokt. Diss. Azerb.ped. in-t. im. V.I.Lenina. Baku, s.1-336.
5. Abdullayev, Q., Əliyev, M. (2012). Heyvandarlığın əsasları. Bakı: Elm və təhsil, 331 s.

6. https://www.semanticscholar.org/paper/A-Preliminary-Study-on-the-Rumen-Ciliate-Fauna-of-I-%C3% 96 ktem G%C3%B6%C3%A7men/440c4f846516f71c976df5286fcc65bb44c1fae8
7. Jouany, J., Ushida, I. (1999). The role of protozoa in feed digestion: review. Asian Australas J Anim Sci. 12 (1):113-28.
8. Park, T., Yu, Z. (2018). Aerobic cultivation of anaerobic rumen protozoa. Entodinium caudatum and Epidinium caudatum. J Microbiol Methods. 152:186-93.
9. Mah, R. (1964). Factors influencing the in vitro culture of the rumen ciliate Ophryoscolex purkynei Stein. J.Protozool. 11:546.
10. Dawson, R., Hemington, N. (1974). Digestion of grass lipids and pigments in the sheep rumen. British Journal of Nutrition 32:327-340.
11. Coleman, G. (1958). Maintenance of oligotrich protozoa from the sheep rumen in vitro. Nature. Lond, 182:1104.
12. https://www.microbiologyresearch.org/content/journal/micro/10.1099/00221287-57-1-818.
13. https://pubmed.ncbi.nlm.nih.gov/4980724/
14. https://www.semanticscholar.org/paper/New-rumen-ciliate%2C-Entodinium-kastamonicum%2C-new-Bos-G%C3%BCrelli/428a5ae12d4ceaf3ee7ec4c4b198c4f613e5e503

**Rəyçi: b.e.d. Daşqın Qənbərov**

Göndərilib: 20.11.2023 Qəbul edilib: 19.01.2023

**KİMYA**

**CHEMISTRY**

DOI: https://doi.org/10.36719/2707-1146/29/28-36

**Fizzə Sadıx qızı Məmmədova**
Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi
Təbii Ehtiyatlar İnstitutu
kimya üzrə fəlsəfə doktoru
fizze.mammadova@mail.ru
**Gültəkin Sədrəddin qızı Hacıyeva**
Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi
Təbii Ehtiyatlar İnstitutu
dissertant
gulyasadiq2021@gmail.com
**Havva Cəni qızı Cəfərova**
Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi
Təbii Ehtiyatlar İnstitutu
ferecovahavva@gmail.com
**Əliəddin Dəyyan oğlu Abbasov**
Naxçıvan Dövlət Universiteti
kimya elmləri doktoru
ada.nat.res@mail.ru
UOT 546. 06. 504-43

# NAXÇIVAN MUXTAR RESPUBLİKASI ƏRAZİSİNDƏ YERALTI SULARIN EKOLOJİ VƏ KİMYƏVİ GÖSTƏRİCİLƏRİ

**Xülasə**

Məqalədə Naxçıvan Muxtar Respublikasının yeraltı sularının ümumi xarakteristikası, onların istifadə perspektivləri və əsas eko-kimyəvi xüsusiyyətləri işıqlandırılır. Muxtar respublikanın hidrogeologiyasının praktiki və nəzəri problemləri, yeraltı suların yayılma qanunauyğunluqları, kimyəvi tərkiblərinin formalaşması, yararlılıqları nəzərdən keçirilir. Ərazinin yeraltı suları öz coğrafi, geoloji, fiziki-kimyəvi və ekoloji keyfiyyətlərinə görə səciyyələnir. Ətraf mühitin vahid sistemində mühüm vəzifələr sırasına su ehtiyatlarının öyrənilməsi və səmərəli istifadəsi də daxildir, çünki onlar sənaye, kənd təsərrüfatı, kommunal-məişət təsərrüfatının və əhalinin su təchizatının əsas mənbəyidir. Bununla əlaqədar olaraq muxtar respublikada rayonların su təchizatının hidro-ekoloji vəziyyətinin öyrənilməsi, yeraltı su mənbələrinin ekoloji təhlükəsizliyinin qiymətləndirilməsi zərurəti yaranır. Məqalədə ərazi üzrə ümumi çirklənmə əmsallarının qiymətlərinə görə mövcud yeraltı suların eko-kimyəvi xüsusiyyətləri müqayisəli təhlil edilmişdir.

***Açar sözlər:*** *hidro-geoloji mühit, hidrosistem, yeraltı sular, ümumi çirklənmə əmsalı, ekoloji-kimyəvi xüsusiyyətlər, ekoloji qiymətləndirmə*

**Fizza Sadikh Mammadova**
Ministry of Science and Education of the Republic of Azerbaijan
Institute of Natural Resources
Candidate of chemical sciences
fizze.mammadova@mail.ru
**Gultakin Sadraddin Hajiyeva**
Ministry of Science and Education of the Republic of Azerbaijan
Institute of Natural Resources

dissertatist
gulyasadiq2021@gmail.com
**Havva Jani Jafarova**
Ministry of Science and Education of the Republic of Azerbaijan
Institute of Natural Resources
ferecovahavva@gmail.com
**Aliaddin Dayyan Abbasov**
Nakhchivan State University
Doctor of chemical sciences
ada.nat.res@mail.ru

## Ecological and chemical indicators of groundwater in the territory of Nakhchivan Autonomous Republic

### Abstract

The general characteristics of underground waters of Nakhchivan Autonomous Republic, their prospects of use and main eco-chemical characteristics are highlighted in the article. The practical and theoretical problems of the hydrogeology of the autonomous republic, the laws of distribution of underground water, the formation of its chemical composition, and its usefulness are considered. Groundwater of the area is characterized by its geographical, geological, physical-chemical and ecological qualities. Studying and efficient use of water resources is one of the important tasks in the integrated system of the environment, because they are the main source of water supply for industry, agriculture, communal economy and the population. In connection with this, there is a need to study the hydro-ecological condition of the water supply of the regions in the autonomous republic, to assess the ecological safety of underground water sources. The eco-chemical properties of existing underground waters in the autonomous republic were comparatively analyzed according to the values of general pollution coefficients for the territory.

***Keywords:*** *hydrogeological environment, hydrosystem, groundwater, general pollution coefficient, ecological-chemical properties, ecological assessment*

### Giriş

Əhalinin keyfiyyətli içməli su ilə təminatı məsələsi bir sıra müxtəlif təbii və antropogen amillərdən asılı olub, regionda ekoloji vəziyyətin formalaşmasının əsas aspektlərindən biridir. Təbii suların çirklənmə mənbələri və çirklənmə proseslərinin mənşəyi suların özü kimi çox qədim zamanlardan axıb gəlir (Abbasov, 2015: 79). Suların keyfiyyətinin potensial pisləşməsi zonasına daxil olan fərqli hidrogeoloji şəraitə malik ərazilər suyun keyfiyyətinin çirklənmə mümkünlüyünün müxtəlif dərəcələri ilə xarakterizə olunur. Bununla əlaqədar olaraq suların keyfiyyətinin potensial çirklənmə zonasının aşağıdakı təsnifatı təklif olunur: 1- böyük təhlükəli, 2 – müntəzəm təhlükəli, 3 – orta təhlükəli, 4 – az təhlükəli, 5 – təhlükəsiz sular.

Yeraltı suların mövcud çirklənmə mənbələri daimi, periodik fəaliyyətli və təsadüfi növlərə ayrılır (Abbasov, 2018: 257). Çirklənmə dərəcəsinə görə yeraltı suların tərkibinə ən çox sənaye tullantıları təsir göstərir. Faza vəziyyətlərinə görə tullantılar öz növbəsində bərk, maye, qaz və qarışıq halında olur. Yeraltı suların fiziki-kimyəvi xassələrinin və tərkibinin daha çox dəyişmələri sənaye axıntılarının filtrasiyası nəticəsində baş verir. Maye halında mövcud olan sənaye tullantılarının çirklənmiş komponentləri dörd qrupa ayrılır:

1) Spesifik zəhərli xassəli qeyri-üzvi birləşmələr,
2) Spesifik adi xassəli qeyri-üzvi birləşmələr,
3) Spesifik zəhərli xassələrə malik üzvi birləşmələr,
4) Spesifik adi xassəli üzvi birləşmələr.

Birinci qrupa qeyri-üzvi xammal istehsal edən kimya sənayesinin tullantı suları aiddir. İkinci qrupa dağ-mədən, filiz zənginləşdirmə və s. müəssisələrin tullantı suları daxildir. Üçüncü qrup tullantı sularına

üzvi sintezlə məşğul olan kimya, neft kimyası, neft emalı və sellüloz-kağız istehsal edən müəssisələrinin tullantıları aiddir. Onların içərisində boyalar, qatranlar, fenollar, qurğuşun, sintetik yağ turşuları, spirtlər və s. zəhərli tullantılar hesab edilir. Dördüncü qrupa maya, kartof nişasta, şəkər, pivə və digər qida məhsulları istehsal edən zavodların tullantı suları daxil edilir. Dördüncü qrup tullantı suları sudaşıyıcı laylara sızaraq suyu zəhərləmədən, onun keyfiyyətini pisləşdirirlər.

Sənaye tullantılarından əlavə məişət və kənd təsərrüfatı tulantıları da geniş yayılmışdır. Ümumi şəkildə məişət tullantıları $NH_3$, $H_2S$, üzvi kationlar, aldehidlər, bir sıra spirtlər, mikroelementlər (B, Cd, Hg, Cu, Pb, Zn, Cr, Ni), mikroorqanizmlər, nitrobirləşmələr, benzol, yağlar, benzin, neft və s-dən ibarətdir.

Yeraltı suların bərk məişət tullantıları ilə çirklənməsi tullantıların parçalanma dərəcəsi ilə müəyyən olunur. Bərk tullantıların 50%-i minerallaşır və yeraltı sularda miqrasiya edən sadə üzvi birləşmələrə parçalanır. Parçalanmanın xarakteri və məhsulları müxtəlifdir və birbaşa oksidləşmə-reduksiya şəraitindən asılıdır. Oksidləşdirici şəraitdə tullantıların parçalanması sürətli və sona qədər gedir. Parçalanma məhsulları arasında karbon qazı və sadə mineral birləşmələr üstünlük təşkil edir. Oksidləşmə şəraitində bərk məişət tullantılarının tam parcalanması nəticəsində yeraltı sular $Cl^-$, $SO_4^{2-}$, $PO_4^{3-}$, $Na^+$, K+, $Fe^{2+}$, $Mg^{2+}$, $NO_3^-$, $HCO_3$-,$CO_3^{2-}$ ionları ilə zənginləşir. Nəticədə onların ümumi minerallığı və codluğu artır( Məmmədova, (2021: 55). Bu zaman sulara xüsusi cövhərlər (məsələn, selen) daxil olur və böyük miqdar anaerob bakteriyalar yaranır. Reduksiyaedici şəraitdə bərk məişət tullantılarının parçalanması sona qədər getmir, yeraltı sular parçalanmanın aralıq məhsulları ilə zənginləşir. Bura yağlar, spirtlər, aldehidlər, yağ turşuları, sulfidlər və s. daxildir. Nəticədə yeraltı sulara böyük miqdar anaerob bakteriyalar və mikroorqanizmlər keçir. Kənd təsərrüfatı tullantıları mineral və üzvi gübrələrin istifadəsi, heyvandarlıq kompleksləri, quşçuluq fabrikləri, ferma və tövlələrin mövcudluğu ilə əlaqədardır. Gübrələrin istifadəsindən yeraltı sulara azot, fosfor, kalium, kalsium, maqnezium, natrium, ammonyak, nitrit, sulfat, fosfat və hidrokarbonatlar daxil ola bilir (Belousova, 2006, 194-106). Heyvandarlıq kompleksləri və digərləri yeraltı suları xlor, natrium, azot birləşmələri, ammonyak və hidrokarbonatlarla çirkləndirmək qabiliyyətinə malikdirlər. Yeraltı sulara sızan kənd təsərrüfatı tullantıları eyni zamanda müxtəlif mikroelementlərlə zəngindir (Vorobeva, 2001: 130).

## Təcrübi hissə

Yeraltı suların kimyəvi tərkibini və keyfiyyətini müəyyən etmək üçün muxtar respublikanın bütün ərazisini əhatə edən obyektlərdən götürülmüş su nümunələri təhlil edilmişdir. Bütün nümunələr üzrə minerallıq dərəcəsi, codluq, kalsium, maqnezium, hidrokarbonat, xlorid, sulfat, natrium və kalium ionlarının miqdarı təyin edilmiş, göstərilən komponentlərin suda qatılığı mq-ekv/l-lə ifadə edilmişdir. Suların ümumi codluğu turşulu xrom göyündən indikator kimi istifadə etməklə ammonyak bufer məhlulu mühitində su nümunəsini standart trilon B məhlulu ilə titrləməklə təyin edilmişdir (Qreyder, 2005: 36-42). Ümumi codluq $C=Ntr{\cdot}B\ {\cdot}k{\cdot}1000/V_{H2O}$ (mq-ekv/l) formulu ilə hesablanmışdır. Bu formulda Ntr·B və Vtr·B –trilon B məhlulunun normallığı və titrlənməyə sərf olunan həcmi (ml), K-düzəliş əmsalı, $V_{H2O}$-analiz üçün götürülən suyun (alikvotun) həcmidir (ml).

Kalsium və maqnezium kompleksonometrik üsulla mureksid ($Ca^{2+}$ üçün) və erioxrom qarası T–dən ($Mq^{2+}$ üçün) indikator kimi istifadə etməklə ammonyak bufer məhlulu mühitində trilon B məhlulu ilə titrləməklə təyin edilmiş və bu elementlərin miqdarı

$$X_{Ca} = V_1 \cdot M \cdot 40{,}08 \cdot 1000/V,$$
$$X_{Mg} = V_1 \cdot M \cdot 24{,}32 \cdot 1000/V,$$

formulu ilə hesablanmışdır (Ponomarev, 1983: 75-85). Bu formullarda M - trilon B məhlulunun molyarlığı, $V^1$-titrləməyə sərf olunan trilon B məhlulunun həcmi (ml), V-analiz üçün götürülən suyun həcmidir (ml).

Xlorid- ionunun miqdarı paralel olaraq iki üsulla - kalium xromatdan indikator kimi istifadə etməklə $Hg(NO_3)_2$ və $AgNO_3$ məhlulları ilə, $HCO_3^-$ ionunun miqdarı isə metil narıncısının iştirakı ilə su nümunəsini 0,1 N standart HCl məhlulu ilə titrləməklə təyin edilmişdir (Friţç, 1978: 215). Sulfat ionunun miqdarının təyini metanol mühitində Alizarin qırmızısı S-in iştirakı ilə $BaCl_2$

məhlulu ilə titrləməklə həyata kecirilmişdir (Posoxov, 1985: 92). $Cl^-$, $HCO_3^-$, $SO_4^{2-}$ ionlarının miqdarı $X=N·v·E_A /1000V_A$ formulu ilə hesablanmışdır. Bu formulda N və v-titrantın normallığı və titrlənməyə sərf olunan həcmi (ml), $E_A$ və $V_A$- təyin olunan komponentin ekvivalenti və analiz üçün götürülən həcmi (ml), v- analiz üçün nəzərdə tutulan məhlulun həcmidir (ml).

$Na^+$ və $K^+$ ionlarının ümumi miqdarı bir necə nümunədə alovlu fotometriya üsulu ilə, qalanlarda isə ekstrapolyasiya metodu ilə tapılmışdır. Suların pH-ı EV-74 ionometri ilə yoxlanmışdır. Ümumi minerallaşma dərəcəsi 100 -ml su nümunəsini ehtiyatla buxarlandırıb, alınan quru kütləni analitik tərəzidə çəkməklə müəyyən edilmişdir.

## Nəticələrin müzakirəsi

Bölgənin böyük çayları Arpaçay, Naxçıvançay, Əlincəçay, Gilançay, Vənəndçay, Ordubadçay, Gənzəçay və Arazın sol qollarını təşkil edən çaylar muxtar respublikanın ümumi hidroqrafik şəbəkəsini müəyyən edir (Mamedova, 2017: 33-37). Son illər su ehtiyatlarından daha səmərəli istifadə etmək məqsədi ilə əsas çayların yataqları üzərində kompleks məqsədli yeni və iri su qovşaqlarının yaradılması hidroloji şəbəkənin dəyişməsi ilə bərabər hidroflora və hidrofauna üçün tamamilə yeni ekoloji şəraitin meydana çıxmasına səbəb olmuşdur. Məlumdur ki, muxtar respublikanın hər bir çay ekosistemində özünə məxsus dib onurğasızlarının qrupları və onların yaşayışı üçün əlverişli sayıla bilən ekoloji şəraitə uyğun olan müxtəlif biotoplar mövcuddur. Müəyyən edilmişdir ki, muxtar respublika ərazisi çaylarına xas olan sel hadisələri dib faunanın formalaşmasına təsir edir. Güclü sel axını və sel kütləsi dib orqanizmlərini yuyub aparır, nəticədə cay ekosistemlərində dib faunanın növ tərkibi tədricən azalır.

Muxtar respublikanın su təchizatında böyük rol oynayan yeraltı suların keyfiyyətinin gigiyenik meyarı onların yol verilən qatılıqları ilə müəyyən olunur (YQH). Onların normaları organoleptik və sanitar-toksikoloji göstəricilərə görə qiymətləndirilir (Pitevaya, 1988: 75). Göstəricilərin birinci qrupu suyun fiziki-kimyəvi xassələri (dad, qoxu, şəffaflıq və s.), ikincisi isə toksiklik və insan orqanizmində normallaşdırılmış elementlərin və birləşmələrin toplanmasının mümkünlüyü ilə bağlıdır. Suyun keyfiyyətinin qiymətləndirilməsi zamanı onun tərkibinin yüksək keyfiyyət kateqoriyalı suya olan tələblərinə uyğunluğu baxımından makrokomponentlər arasında YQH – nin daha çox hissəsi natrium ionları (62%), ikinci yerdə kalsium və maqnezium ionlarının ümumi qatılığı (30%), üçüncü yerdə isə hidrokarbonatlar (12,8%) və xlor ionları (12,6%) səciyyəvidir (Pitevaya, 1988: 224). Qablaşdırılmış suyun makro və mikroelement tərkibinin fizioloji faydalılığı onun bu cədvəldə göstərilən standartlara uyğunluğu ilə müəyyən edilir (Cədvəl 1.).

**Cədvəl 1.**
**Qablaşdırılmış su tərkibinin makro və mikrokomponentləri üçün standartlar (SanPiN 2.1.4.1116-02 uyğun olaraq)**

| Göstəricilər | Ölçü vahidi | İçməli suyun fizioloji faydalılığı üçün standartlar | Qablaşdırılmış suyun keyfiyyət standartları | |
|---|---|---|---|---|
| | | | Birinci kateqotiya 1000 | Yüksək kateqoriya 200-500 |
| Ümimi minerallıq, quru qalıq | mq/l | 100 - 1000 | 1000 | 200-500 |
| Codluq | mq-ekv/l | 1,5 - 7 | 7,0 | 1,5-7 |
| Qələvilik | mq-ekv/l | 0,5 - 6,5 | 6,5 | 0,5-6,5 |
| Kalsium (Ca) | mq/l | 25 – 130 | 130 | 25 – 80 |
| Maqnezium (Mg) | «__» | 5 - 65 | 65 | 5 - 50 |
| Natrium+kalium (Na+K) | «__» | – | 20 | 2 - 20 |
| Hidrokarbonat ($HCO_3$) | «__» | 30 - 400 | 400 | 30 -40 |

